**UOT 636.084/087**

# TAM DƏYƏRLI YEMLƏMƏNIN INKIŞAFDA OLAN BUZOVLARIN EKSTERYER ÖLÇÜLƏRINƏ TƏSIRI

**S.C. ƏLİYEVA**
**AKTN Əkinçilik ElmiTədqiqat İnstitutu**

*Buzovlar tam dəyərli yem rasionları ilə yemləndirildikdə onlar böyük, hündür, döşün eni və dərinliyi daha dolğun olur.*

***Açar sözlər:*** *buzov, tam dəyərli yemləmə, eksteryer ölçüləri, gövdə quruluşu*

Respublikada heyvandarlığın inkişafı, onun məhsuldarlığının artırılması və məhsulun keyfiyyətinin yaxşılaşdırılmasında başlıça amillərdən biri cavan heyvanların düzgün yemləndirilməsi və bəslənməsidir. Gələcəkdə yüksək məhsuldar inəklər yetişdirmək üçün cavanların (buzovların) düzgün, qida maddələri ilə tarazlaşdırılmış tam dəyərli yem payları ilə yemləndirilməsi əsas məsələlərdən biridir. Bioloji xüsusiyyətləri nəzərə alınaraq cavan buzovlar istiqamətli yemləndirildikdə nəzərdə tutulmuş məhsuldar inəklər yetişdirmək mümkündür.

Heyvanlar, xüsusən də inkişafda olan cavanlar norma əsasında düzgün yemləndirildikdə onlar sürətlə böyüyür, möhkəm bədənli, sağlam, yaxşı çoxalma qabiliyyətinə və yüksək məhsuldarlığa malik olurlar. Əksinə pis yemlənən heyvanların canlı kütləsi az, əzələləri cılız, bədən quruluşu nöqsanlı, məhsuldarlığı aşağı, törədicilik qabiliyyəti zəif olur. Cavan heyvanların inkişafı heç şübhəsiz onların bütün həyatı boyu aldığı qida maddələrinin kəmiyyət və keyfiyyətindən çox asılıdır. Məhz, buna görə də sağlam və yüksək məhsuldar inəklər yetişdirmək üçün buzovların düzgün yemləndirilməsinə və bəslənməsinə diqqət yetirilməlidir.

Elm sübut etmişdir ki, heyvanlar üçün yem payları və yem rasionları düzgün tərtib edilmədikdə, xüsusilə də yem rasionlarının tərkibində qida maddələri çatışmadıqda və ya həddindən artıq olduqda, bu hər şeydən əvvəl orqanizmdə maddələr mübadiləsinin pozulmasına və onun normal inkişafına mənfi təsir göstərməklə məhsuldarlığın xeyli azalmasına, cavanlarda inkişafın zəifləməsinə, vahid məhsul üçün daha çox yem sərf olunmasına və məhsulun maya dəyərinin yüksəlməsinə səbəb olur (3).

Cavan heyvanların böyüməsində və inkişafında düzgün yemləmə texnologiyasının xüsusi əhəmiyyəti vardır. Düzgün yemləmə onların diri çəkisi ilə bilabasitə əlaqədardır. Buna görə də hər bir cavan heyvan üçün düzgün yemləmənin təşkili, yəni tələb olunan miqdarda qida maddələri ilə zəngin olan tam dəyərli yem payları ilə yemləndirilməsi əsas şərtlərdən biridir (5, 6, 7).

Cavan qaramalda arzu olunan hər hansı keyfiyyətin yaranması onun böyümə və inkişafının ilk günlərindən başlayaraq bəslənilməsinin müəyyən istiqamətdə aparılmasından asılıdır . Qeyd etmək lazımdır ki, düzgün yemlənmə və bəslənmə şəraitində heyvanlarda bəzi yaxşı əlamətlər əmələ gəlir. Cavan heyvanın formalaşması, yüksək məhsuldarlığa çatması üçün yemləmənin göstərdiyi təsir, cinsin təsirindən daha çoxdur. Məhz buna görə də gələcəkdə sağlam və yüksək məhsuldar inəklər yetişdirmək üçün buzovlar istər südəmər dövrdə, istərsə də bu dövrdən sonra müəyyən sxem və normalar üzrə yemləndirilməlidir (2).

Yuxarıda qeyd edilənləri nəzərə alaraq respublikamızın fermer təsərrüfatlarında gələcəkdə yüksək nəhsuldar inək naxırının yaradılması məqsədilə cavan iri buynuzlu heyvanların düzgün yemləndirilməsinin elmi əsaslarla öyrənilməsi məqsədə uyğun hesab edilir. Odur ki, tədqiqatın aparılmasında məqsəd südəmər dövründən sonra buzovların müxtəlif tərkibli yem rasionları ilə yemləndirilməsinin səmərəliliyinin öyrənilməsi olmuşdur.

Tədqiqatlar Abşeron rayonundakı S.Əliyev adına südlük-maldarlıq üzrə Dövlət damazlıq Kənd Təsərrüfatı İstehsalı Müəssisəsi MMC-də aparılmışdır. Təcrübələr qoyulmazdan öncə təsərrüfatda istifadə olunan yemlərin keyfiyyət göstəriciləri və ümumi qidalılıq dəyəri öyrənilmişdir (cədvəl 1).

İnkişafda olan cavan iri buynuzlu heyvanların istiqamətli və tam dəyərli yem payları ilə yemləndirilməsinin səmərəliliyini öyrənmək məqsədilə, analoqlar üzrə hər birində 6 baş olmaqla, 2 qrup 9-10 aylıq yaşda buzovlar ayrılmaqla təcrübələr qoyulmuşdur. Təcrübə 270 gün müddətində davam etdirilmişdir.

Cədvəl 1

**Təsərrüfatda istifadə olunan yemlərin kimyəvi tərkibi və qidalılıq dəyəri**

| Yemlərin adı | Kimyəvi tərkibi, % | | | | | | 1 kiloqramda | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | Nəmlik | Quru maddə | Xam protein | Xam yağ | Xam sellüloza | Xam kül | EYV | Həzm olunan protein, q | Karotin mq |
| Quru yonca otu | 15, 5 | 84, 5 | 17, 3 | 2, 6 | 22, 3 | 6, 8 | 0, 95 | 143 | 98 |
| Xaşa otu | 79, 32 | 20, 68 | 16, 0 | 2, 6 | 24, 0 | 7, 9 | 0, 78 | 127, 6 | 68 |
| Çəmən yulafı | 76, 82 | 23, 18 | 12, 4 | 2, 3 | 25, 5 | 9, 7 | 0, 62 | 47, 5 | 17 |
| Arpa dəni | 86, 5 | 13, 5 | 11, 6 | 2.3 | 5, 7 | 2, 0 | 1, 04 | 80, 7 | 1 |
| Arpa küləşi | 68, 29 | 31, 71 | 3, 9 | 1, 9 | 37, 5 | 4, 9 | 0, 42 | 13 | 2 |
| Kəpək | 13, 12 | 86, 88 | 15, 8 | 3, 4 | 11, 0 | 12, 2 | 0, 99 | 97, 7 | 0 |
| Qarğıdalı unu | 18, 57 | 81, 43 | 9, 7 | 3, 7 | 3, 5 | 3, 9 | 1, 04 | 76 | 3 |
| Yaşıl yonca otu | 75, 60 | 24, 4 | 4, 8 | 0, 9 | 7, 5 | 8, 4 | 0, 24 | 37, 2 | 130 |

Hər 2 qrupa daxil olan buzovlar təsərrüfat üzrə qəbul edilmiş yem payları ilə yemləndirilmişdir. Lakin bu qrupların fərqlənməsi ücün, II qrup (təcrübə qrupu) heyvanların yem payına zülal, mineral maddələr və vitaminlərlə zəngin olan yem konsentrantı kolfostonik əlavə edilmişdir (cədvəl 2).

**Cədvəl 2**

**Qruplar üzrə buzovların yem payının tərkibi**

| Rasionun tərkibi | Buzovların yaşı ayla | | | | | |
|---|---|---|---|---|---|---|
| | 9-10 | | 13-14 | | 17-18 | |
| | Q r u p l a r | | | | | |
| | I | II | I | II | I | II |
| Quru yonca otu, kq | 1, 5 | 2, 0 | 2, 5 | 2, 5 | 2, 5 | 3, 0 |
| Arpa küləşi, kq | 1, 5 | 2, 0 | 2, 5 | 2, 7 | 2, 7 | 3, 0 |
| Kəpək, kq | 1, 0 | 1, 8 | 2, 0 | 2, 2 | 2, 2 | 2, 5 |
| Qargidalı unu, kq | - | - | - | 1, 0 | 1, 0 | 1, 0 |
| Yaşıl yonca otu, kq | - | - | - | - | 30 | 30 |
| Yem konsentratı (kolfostonik), q | - | 30 | - | 34 | - | 38 |

Tədqiqatların nəticəsi göstərir ki, buzovlar tarazlaşdırılmış yem rasionları ilə yemləndirildikdə onlar normal inkişaf etməklə yanaşı, həm də yüksək damazlıq keyfiyyətinə malik olurlar.

Sağlam və yüksək məhsuldar heyvanlar yetişdirmək üçün onların düzgün eksteryer (bədən ölcüləri) və yüksək həyat qabiliyyətinə malik olması tələb olunur.

Apardığımız tədqiqatın nəticələri heyvanların eksteryer ölşülərini öyrənməklə onların gövdə quruluşunun möhkəmliyini və bunun məhsuldarlığa təsirini təyin etməyə imkan verir. Hətta eksteryer xüsusiyyətlərin düzgün öyrənilməsi orqanizmin ifrat zəifləməsinə və ya inkişaf etməsinə, məhsuldarlığının azalmasına, iqlimə alışma qabiliyyətinə təsir edən səbəbləri tədqiq etməyə imkan verir (4).

Buna görə də heyvanlarda eksteryer xüsusiyyətlərin öyrənilməsi olduqca vacib məsələlərdən biri hesab edilir. Bu amilin öyrənilməsi heyvanın hansı cinsə aid olduğunu, məhsuldarlıq istiqamətini, onun sağlamlığını və təsərrüfat dəyərliliyini, ümumiyyətlə bütün damazlıq keyfiyyətini müəyyən etməyə imkan verir.

Bu göstərilənləri nəzərə alaraq aparılmış təcrübələrdə heyvanların fərdi olaraq eksteryer ölçüləri (cidov hündürlüyü, sağrı və oturacaq sümüklərinin hündürlüyü, döşün və ombalar arası en, incik qucumu, başın eni və uzunluğu) 2 dəfə- təcrübənin əvvəlində və sonunda öyrənilmişdir (cədvəl 3).

**Cədvəl 3**

**Təcrübə heyvanlarının orta eksteryer ölçüləri (sm-lə)**

| s/s | Bədən ölçüləri | Q r u p l a r | | | |
|---|---|---|---|---|---|
| | | Təcrübə qoyulduqda | | Təcrübənin sonunda | |
| | | I | II | I | II |
| 1 | Cidov hündürlüyü | 101 | 100 | 107 | 111 |
| 2 | Dalın hündürlüyü | 102 | 102 | 108 | 112 |
| 3 | Belin hündürlüyü | 101 | 101 | 108 | 117 |
| 4 | Sağrı hündürlüyü | 103 | 103 | 108 | 112 |
| 5 | Oturacaq sümüklərinin hündürlüyü | 103 | 103 | 108 | 112 |
| 6 | Gövdənin çəpinə uzunluğu | 113 | 113 | 120 | 125 |
| 7 | Döş qucumu | 123 | 124 | 137 | 146 |
| 8 | Döşün eni | 24 | 26 | 31 | 36 |
| 9 | Döşün dərinliyi | 50 | 49 | 56 | 61 |
| 10 | Omba sümüklərinin eni | 34 | 33 | 37 | 41 |
| 11 | İncik qucumu | 16 | 16 | 18 | 20 |
| 12 | Başın uzunluğu | 28 | 29 | 26 | 32 |
| 13 | Başın (alnın) böyük uzunu | 20 | 21 | 21 | 24 |

Tədqiqatların nəticəsi göstərir ki, buzovların müxtəlif tərkibli yem rasionları ilə yemləndirilməsi onların nəinki çəki artımına, həmçinin eksteryer ölçülərinə də müəyyən dərəcədə təsir göstərmişdir. Belə ki, təcrübənin başlanğıcında qruplar üzrə bədən ölçüləri təqribən bir-birinə yaxın olmuşdusada, təcrübənin sonunda bu göstəricilər arasında xeyli fərq müşahidə edilmişdir.

Məlumdur ki, heyvanların inkişafını xarakterizə edən əsas göstəricilər bədənin çəpinə uzunluğu, döş qucumu, döşün eni, dərinliyi və incik qucumu hesab edilir. Bu göstəricilər heyvanın gövdə uzunluğunu, döş qəfəsinin və döşün inkişafını, həmçinin sümüklərin inkişafını əks etdirir. Qeyd etmək lazımdır ki, təcrübə qoyulduğu zaman qruplar üzrə bu göstəricilər eyni olsalar da, təcrübənin sonunda II qrup heyvanlarda I nəzarət qrupuna nisbətən orta hesabla bədənin çəpinə uzunluğu 9 sm, döş qucumu 9 sm, döşün eni və dərinliyi 5 və 9 sm, incik qucumu

2 sm artmışdır. Bu fərqlər digər ölçülərdə də özünü göstərir (şəkil 1).

**Şəkil 1. Təcrübə altında olan heyvanların (buzovların) eksteryer ölçüləri, sm-lə**




Eksteryer ölçülər və indekslər qruplar üzrə müqayisə edildikdə aydın olur ki, II qrup buzovlar I qrupda olan buzovlara nisbətən daha böyük, hündür, döşün eni və dərinliyi daha dolğun və uzun gövdəyə malik olmaları ilə fərqlənmişlər. Bunu buzovların bütün qida maddələrinə olan tələbatının tam ödənilməsi, yəni tam dəyərli yem rasionları ilə yemləndirilməsi ilə izah etmək olar (cədvəl 4).

Ümumiyyətlə, tədqiqatın nəticəsi göstərir ki, südlük istiqamətdə yetişdirilən buzovlar tam dəyərli yem rasionları ilə yemləndirildikdə və düzgün istiqamətdə bəsləndikdə (II qrup) istər diri çəkilərinə (çəki artımına) və istərsə də eksteryer ölçülərinə görə I nəzarət qrupuna, xüsusən də təsərrüfat üzrə qəbul edilmiş yem rasionları ilə yemləndirilmiş buzovlara nisbətən boyunun uzun, döşün dərin və uzun olması, qarnın geniş həcmli və güclü inkişafı (sallaq olmaması), dalın yaxşı inkişafı, ayaqların nisbətən uzun olması və digər göstəriciləri gələcəkdə onların daha məhsuldar və sağlam olmasını göstərən əsas əlamətlərdir.

**Cədvəl 4**

**Qruplar üzrə buzovların gövdə quruluşu indeksləri (qruplar üzrə orta hesabla, sm-lə)**

| İndekslər | Təcrübə qoyulduqda | | Təcrübənin sonunda | |
|---|---|---|---|---|
| | I | II | I | II |
| Uzunayaqlılıq | 50, 2 | 50, 0 | 50, 0 | 49, 8 |
| Gövdə uzunluğu və ya format | 108, 9 | 109, 3 | 117, 3 | 119, 9 |
| Döş indeksi | 50, 0 | 50, 7 | 55, 96 | 58, 4 |
| Sarğı dikliyi | 102, 4 | 102, 1 | 104, 8 | 107, 8 |
| Kütləlik | 122, 7 | 122, 8 | 131, 9 | 139, 0 |
| Sümüklülük | 15, 8 | 15, 9 | 17, 4 | 19, 0 |
| İri başlılıq | 27, 7 | 27, 8 | 27, 9 | 30, 6 |
| Çanağın enliliyi | 26, 2 | 26, 1 | 30, 8 | 40, 6 |
| Dolğunluq | 113, 9 | 114, 7 | 124, 4 | 130, 2 |

Nəzarət qrupunda olan buzovların nisbətən zəif inkişaf etməsi, yəni bu qrup buzovlarda arxa və belin sallaqlığı, qarnın sallaqlığı, döşün dar və zəif olması mühüm nöqsanlar sayılır ki, bu da gələcəkdə onlardan tam gözlənilən məhsulun alınmamasını şərtləndirir.

## ƏDƏBİYYAT

**1.** Abdinov F. Kənd təsərrüfatı heyvanlarının yemləndirilməsinə dair praktiki məşğələlər. Bakı, 1963. **2.** Səttarov C.X. Cavan iribuynuzlu heyvanların tam dəyərli yem rasionları ilə yemləndirilməsinə dair tövsiyələr. Bakl, 2010, 42 s. **3.** Səttarov C.X. Fermer təsərrüfatlarında istifadə olunan yemlərin keyfiyyət göstəriciləri və ümumi qidalılıq dəyərinə əsaslanaraq inəklərin ən səmərəli yem rasionları ilə yemləndirilməsinə dair tövsiyələr. Bakı, 2007, 29 s. **4.** Tomme M.F., Novikov E.A. Ümumi zootexniya. Bakı, 1954, 508 s. **5.** Верeников А.И., Гуревич И.Я., Дмитроченко А.П., Иванкин И.К., Чубинская А.А. Выращивание молодняка сельскохозяйственных животных. М, 1983, 231 с. **6.** Клейменов Н.И. Полноценное кормление молодняка крупного рогатого скота. Москва, 1975. **7.** Ошепкова А.И. Отбор и выращивание ремонтных телок. Москва, 1973, 71 с.

### Влияние полноценного кормления на размеры тела растущего организма телят

**С. Дж. Алиева**

В результате кормления телят полноценными кормами они бывают крупными, высокими, глубина и ширина груди более объемной.

***Ключевые слова***: теленок, полноценное кормление, размеры тела, строение туловища.

### The impact of full valuable feeding to exterior standart of calf

**S. J. Aliyeva**

Calf will be big, high and the width and depth of their chest will be good when they feed full valuable food.

***Key words:*** *calf, full valuable feeding, exterior standart, the structure of body.*